**UOT:338.43**

# KƏND TƏSƏRRÜFATI MÜƏSSİSƏLƏRİNDƏ LİZİNQ ÖDƏNİŞLƏRİNİN TƏHLİLİ VƏ SƏMƏRƏLİLİYİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

**Z.Q.QULİYEV**
**Bakı Biznes Universiteti**

*Məqalədə lizinq xidməti göstərən müəssisələrin daha sürətli inkişafına nail olmaq üçün onlara müəyyən güzəştlərin verilməsi zəruriliyi əks olnmuşdur. Belə ki, lizinqverən subyektlər bir neçə illiyə maliyyə lizinq müqavilələrinin satışından əldə edilən mənfəətdən ödənən vergidən azad edilməlidirlər. Onların vergidən azad olması dolayı yolla da olsa, kənd təsərrüfatında lizinqalan subyektlər tərəfindən istehsal olunan məhsulların, göstərilən xidmətlərin maya dəyərinin aşagı düşməsinə, öz istehsalatlarını daha da genişləndirməyə imkan verər.*

*Aradan qaldırılmalı digər məsələlərdən biri də budur ki, ölkə qanunvericiliyinə əsasən, lizinqverən lizinqalan tərəfindən geri qaytarılmış və ya lizinqalandan defolt nəticəsində müsadirə olunmuş lizinq predmeti təkrarən lizinqə verilə bilməməsi yolları göstərilmişdir. Yeni müasir avadanlıqdan istifadə edərək lizinqalan gəlir əldə edir və avadanlıqdan istifadə edilməsinə görə həmin gəlirdən haqq ödəyir.*

***Açar sözlər:*** *lizinq ödənişləri, lizinq predmeti, ssuda faizi, vergi güzəştləri, sığorta ödənişləri, ödənişin forması, lizinq obyekti, lizinqin mükafat məbləği.*

Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkisafı Dövlət Proqramı"nda nəzərdə tutulmuş "Aqrolizinq"ASC-nin fəaliyyət dairəsinə aid olan tədbirlər bütün dünya ölkələrində oldugu kimi Azərbaycanda da lizinq əməliyyatlarının artmasına gətirib çıxardı **[1]**. Əsas məsələlərdən biri isə lizinq əməliyyatlarının qanunvericiliklə tənzimlənməsidir. Ümumiyyətlə götürdükdə Azərbaycanda lizinqin inkişafının əsası 1994-cü il 29 noyabrda qəbul olunan "Lizinq haqqında" Azərbaycan Respublikası Qanununun qəbul edilməsi ilə baglıdır. Həmin qanunda deyilir ki, lizinq– istehlakçının sifarişi əsasında əmlakı satın almaqla onu istehlakçıya orta və uzun müddətə icarəyə vermək məqsədi ilə həyata keçirilən xidmət növüdür. Həmçinin həmin qanunda qeyd olunur ki, lizinq haqqı icarəyə götürülmüş əmlak üçün icarəçinin lizinq müəssisəsinə ödədiyi haqdır **[2]**.

Lizinq ödənişlərinin təhlili zamanı onun mahiyyəti, iqtisadi məzmunu, hansı mənanı ifadə etməyi dedikdə çox zaman bina və qurğuların tam və qismən amortizasiyası başa düşülür. Aydındır ki, təqdim edilmiş belə bir təsvir lizinq ödənişlərinin mürəkkəb tərkibinin bütün iqtisadi tərəflərini tam əks etdirmir. Lizinq ödənişləri lizinq predmetindən istifadə edilməsi zamanı yaranan gəlirin sahibkar ilə icarədar arasında bölünməsi ilə bağlı bərqərar olan iqtisadi münasibətlərin formasını müəyyən etməklə yanaşı həm də icarəyə verən ilə icarədar arasında olan qarşılıqlı hesablaşma formasıdır.

O, digər tərəfdən əsas vəsaitlərin dəyərinin yenidən bərpasını, kapital yığımı və sahibkarlıq fəaliyyətinin təşviq edilməsi funksiyalarını həyata keçirir. Bu və ya digər obyekti lizinqə saziş əsasında verərkən sahibkar onun dəyərinin izafi dəyər ilə birlikdə qaytarılması hüququna malikdir. Lizinq ödənişinin müəyyən edilməsinin obyektiv əsasını əmlakın dəyəri və vəziyyəti, amortizasiya norması və müddəti, ssudanın faizi, vergi güzəştləri və digər şərtlər müəyyən edir. Lizinq ödənişləri öz mahiyyətinə görə üç əsas tərkib hissədən ibarətdir.

-ödənişlərin iqtisadi elementlərə görə tərkibi;
-ödənişlərin həcmi və dərəcəsi;
-hesablaşmaların qaydası **[9]** .

Digər tərəfdən, təsərrüfat münasibətlərində lizinq ödənişlərinin ayrı-ayrı tərkib elementləri bir-birindən fərqlənməyə də bilərlər, lakin onların spesifik funksiyalarının uçotu nəzəri və praktik əhəmiyyət daşıyır. Məsələn, aydındır ki, ilk əvvəl sahibkara məxsus olmuş lizinq predmeti icarədar tərəfindən icarəyə verənə qaytarılan zaman dəyəri və lizinq ödənişlərinin ümumi məbləğində avans şəkildə verilmiş kapital müxtəlif iqtisadi mahiyyətə və təyinata malikdirlər. Lizinq predmetinin alınması ilə əlaqədar ödənilən kredit faizləri, əmlak vergisi, sığorta ödənişləri də eyni iqtisadi mahiyyətə və təyinata malikdirlər. Lizinq ödənişləri anlayışı və onun funksiyaları ilə sxem 1-də tanış olmaq olar.

İqtisadi elementlərin tərkibinə və maddələrinə görə lizinq ödənişləri iki: xalis və ümumi qaydada ödənilir. Lizinq ödənişləri xalis qaydada ödənilərkən icarəyə verilmiş lizinq predmetinin saxlanması ilə bağlı bütün xərclər icarədar tərəfindən ödənilir. İcarəyə verənə isə xalis gəlir ödənilir.

**Sxem 1.**
**Lizinq ödənişi anlayişi və funksiyaları**




Lizinq ödənişləri zamanı ümumi qaydadan istifadə edərkən icarədar lizinq lizinq predmetinin bütün iqtisadi elementlərini icarəyə verənə ödəyir. Icarəyə verən isə lizinq predmetinin saxlanması ilə əlaqədar bütün xərcləri ödəyir. Lizinq ödənişlərinin sabit və dəyişkən hissələrinin bir-birinə uyğunlaşması ödənişlərin bazar tariflərinin onun imkanlarından üstün olduğu hallarda istifadəçiyə öz risklərini azaltmaq imkanını verir, onu istehsal fəaliyyətinin səmərəliliyinin artmasını təşviq edir. Lizinq ödənişlərinin tərkibinə öz funksional təyinatına görə lizinq predmetinin balans dəyərinə və cari fəaliyyəti ilə əlaqədar isə icarəyə verənin məsrəflərinə aid edilən müqavilə şərtləri ilə nəzərdə tutulmuş və əsaslandırılmış xərclər daxil edilir. Müqavilə şərtlərindən asılı olaraq cari və kapital məsrəfləri icarədarın balansında da nəzərə aına bilər **[8]** .

Lizinq predmeti istismara verilən zaman xərclərin bir hissəsi artıq müəyyən edilmiş olur və onun dəyərində öz əksini tapir. Lakin kapital təmiri və zəmanət xidməti ilə əlaqədar xərclər lizinq ödənişləri müəyyən edilərkən tərəflər arasında qabaqcadan razılaşma yolu ilə göstərilə bilər. Lizinq müqaviləsinin qüvvədə olduğu müddət ərzində əvvəlcədən nəzərdə tutulmuş müddəalardan fərqli hallar ola bilir ki, bu da son nəticədə icarəyə verənin maliyyə vəziyyətinin kəskin pisləşməsinə səbəb ola bilər. Lizinq ödənişlərinin müəyyən edilməsinin əsas prinsiplərindən biri də icarəyə verilmiş vəsaitlərin geri qaytarılarkən əlavə dəyər gətrilməsidir.

Lizinq predmetinin geri qaytarılan əlavə dəyərinin həcmi sövdələşmənin predmeti olmur. Çünki, lizinq razılaşması bağlanılan an gəlirin həcmi qabaqcadan müəyyən edilir və lizinq ödənişlərinin tərkibində dəyişilməz olaraq qalır. İstehsal vasitələrinin dəyəri isə məlum olduğu kimi, icarədarın əməyi vasitəsilə yenidən yaradılmış məhsulun üzərinə keçir. Lizinq ödənişlərinin həcminin müəyyən edilməsinin metodoloji əsasını orta gəlir norması səviyyəsində tərəflərin qarşılıqlı maraqlarını təmin edən icarədar tərəfindən yaradılan ümumi gəlirin bölüşdürülməsi mexanizmi təşkil edir. Bundan belə bir nəticəyə gəlmək olar ki, lizinq ödənişlərini icarəyə verənə köçürəndən sonra icarədar, məhsulin təqdim edilməsindən və ya işlərin görülməsindən əldə etdiyi gəlirin hesabına istehsal ilə bağlı xərclərini ödəməklə yanaşı öz istehsalını genişləndirmək və səxsi istehlakını ödəmək üçün əlavə gəlir əldə etməlidir. Nəzəri cəhətdən lizinq ödənişlərinin (Lö) aşağı və yuxarı həddlərini bir-birindən ayırmaq lazımdır. Lizinq ödənişlərinin yuxarı həddi orta gəlir götürmək imkanı olduğu təqdirdə icarədarın iş fəaliyyətinin yüksək rentabelliyi və ödənilən haqqın maqsimum həcmi ilə müəyyən edilir. Belə halda lizinq ödənişlərinə icarəyə verənin xərclərindən (X) əlavə onun gəlirinin maksimal (Gm) həcmidə daxil edilir. Lö=X+Gm **[5]**.

Lizinq ödənişlərinin aşağı həddi onun həcminin minimum səviyyəsi və lizinq predmetinin mümkün sadə təkrar istehsalı ilə müəyyən edilir. İqtisadi mənaca lizinq ödənişlərinin məbləği lizinq predmetinin geri qaytarılarkən müəyyən edilən dəyərindən az ola bilməz, əks halda onun təkrar istehsalı qeyri-mümkün olacaqdır. Lizinq ödənişlərinin konkret həcmi aşağı və yuxarı hədlər

arasında, tələblə təklif asasında və tərəflərin qarşılıqlı razılığına əsasən danışıqlar yolu ilə müəyyən edilir. Praktikada lizinq ödənişlərinin üç əsas formasından istifadə edilir.

-pul forması-bütün ödənişlər pul ifadəsində aparılır;

-natural formada-hesablaşmalar lizinq predmetindən istifadə etməklə istehsal edilən mallar vasitəsilə və ya icarəyə verənə qarşılıqlı xidmət göstərməklə aparılır. Belə hesablaşmalardan ölkədən kənarda istehsal edilmiş avadanlıq və qurğuların alınması ilə bağlı kifayət qədər valyuta vəsaitlərinin olmadığı təqdirdə xarici lizinq əməliyyatları zamanı istifadə olunur.

-qarışıq formada – bu halda pul və kompensasiya xarekteri daşıyan ödənişlərdən tərəflərin razılığına görə, əsasən də ciddi maliyyə siyasəti və böhran hallarında istifadə edilə bilər.

Hesablama üsulundan asılı olaraq lizinq ödənişlərinin dörd növünü göstərmək olar:

-müəyyən edilmiş dərəcə- razılaşmanın ümumi məbləğində pul, natural, qarışıq formada qeyd olunur;

-pay şəklində- ödənişlərin məbləğləri əvvəlcədən deyil, icarəyə götürülmüş lizinq predmetindən istifadə və icarədarın mənfəətində yaxud gəlirində iştirak etməklə, satılmış məhsulun həcmində qeyd edilmiş pay əsasında müəyyən edilir. Bu, lizinq predmetindən istifadə edən icarədar üçün lizinq ödənişlərinin müəyyən edilməsinin çox sadə, əlverişli və münasib üsuludur. Lakin onun catışmayan cəhəti ondan ibarətdir ki, səmərəli, bacarıqlı iş və yüksək maliyyə -istehsal nəticələri əldə edilən zaman lizinq ödənişlərinin məbləği nəzərə çarpacaq dərəcədə artır. Belə vəziyyət zamanı yaranan qəribə məntiq ondan ibarətdir ki, icarədar nə qədər yüksək gəlirlə işləsə, eyni şərtlər zəminində bir o qədər də çox vəsait ödəməlidir, bu da son nəticədə sahibkarlığın təşviq edilməsinə mənfi təsirini göstərəcəkdir;

-cəmi ödənişlər, lizinq müqaviləsinin fəaliyyət müddətində lizinq ödənişlərinin və icarədar tərəfindən icarəyə götürülmüş lizinq predmetinin alınması ilə bağlı icarəyə verənə ödənilən pul vəsaitlərinin cəmidir;

-icarəyə verilmiş lizinq predmetinin dəyərinin faizlə ödənilməsi geniş yayılmış hesablaşma üsuludur. Avadanlığın xarakterindən və ödəmə müddətlərindən asılı olaraq faiz məbləği müxtəlif ola bilər.

İcarədarın iqtisadi vəziyyətindən asılı olaraq ödəmə üsuluna görə lizinq ödənişlərinin aşağıdakı növlərindən istifadə olunur.

-xətti və ya bərabər hissələrlə ödəniş, lizinq ödənişlərinin standart, bərabər eyni tipli üsuludur;

-artan ödəniş növündən istifadə edilən zaman müqavilənin ilk mərhələsində müəyyən həcmdə ilkin ödəniş müəyyən edilir ki, bu da istehsal edilmiş məhsulun həcminin artırılması ilə düz mütənasibdir. Belə münasibətlər məhdud miqdarda ilkin kapitala məxsus sahibkarlar üçün daha da məqsədəuyğundur;

-azalan ödəniş lizinq münasibətlərinin ilk mərhələsində sürətli ödəniş zamanı tətbiq edilir. Belə ödənişlər əmlak sahibinin riskini nəzərə çarpacaq dərəcədə azaltmaqla yanaşı icarədarın azad fəaliyyətini genişləndirməyə imkan verir;

-mövsümi ödənişkənar təsərrüfatında və istehsal prosesi mövsümi xarakter daşıyan və ödəniş imkanları məhsul yığımından sonra yaxşılaşan digər sahələrdə tətbiq edilir. Dövriliyinə görə aşağıdakı lizinq ödənişləri tətbiq edilir;

-birdəfəlik ödənişlər lizinq predmeti icarədara təhvil verildikdən və tərəflər arasında təhvil-təslim aktı imzalandıqdan sonra ödənilirlər;

-dövri ödənişlər aylıq, rüblük, illik olmaqla yanaşı tərəflər arasında təsdiq edilmiş qrafiq əsasında tətbiq edilir;

-avans şəklində ödəniş, sonradan lizinq məbləğinin ümumi həcmindən çıxmaqla lizinq müqaviləsi imzalanan vaxt ödənilir.

Lizinq müqaviləsi imzalanan vaxt tərəflər qarşılıqlı razılığa əsasən konkret şəraitdə məqbul hesab edilə bilən ödəniş üsulundan istifadə edə bilərlər. Lizinq müqaviləsində tərəflərin razılığına əsasən aşağıdakılar qeyd edilirlər;

-lizinq ödənişlərinin həcmi;

-ödənişin forması (pul, natural, qarışıq);

Ödəniş üsulu:

*təsdiq edilmiş ümumi məbləğ göstərilməklə müqavilə müddətində bərabər hissələrlə ödəniş;

*avans şəklində qarşılıqlı razılaşdırılmış həcmdə;

*artan və azalan həcmlərdə;

*ödənişlərinin müddətlərinin uzadılması ilə;

*ödənişlərin dövriliyi (ayda, rübdə, ildə) **[6]** .

Lizinq ödənişləri ilə bağlı öhdəlik icarədar tərəfindən lizinq predmetindən istifadə edilməsi zamanı yaranır. Müqavilə şərtlərində lizinq ödənişlərinin vaxtının, ilk ödəniş ilə bağlı, müəyyən miqdarda gəlir götürmək məqsədi ilə müəyyən müddətə uzadılması barədə razılıq nəzərdə tutula bilər.

Praktikada lizinq müqaviləsinin fəaliyyət müddətində lizinq öhdəliklərinin eyni həcmdə müəyyən edilmiş məbləğlərlə ödənilməsi üsulundan nadir hallarda istifadə edilir.

Əksər hallarda ödənişlərin "azalan" və ya "avans ödəmək" üsullarından istifadə etməyə daha çox üstünlük verilir. **Birinci halda**, dövri ödənilən məbləğlər arasındakı fərqin əhmiyyətli dərəcədə olmasına baxmayaraq onlar lizinq ödənişləri sayılırlar (lizinq müqaviləsi və tərtib edilmiş cədvəldə nəzərdə tutulduğundan) və icarədar tərəfindən vergitutma məqsədlri üçün nəzərə alınır. **İkinci halda**, isə icarədar lizinq ödənişlərindən

başqa lizinq şirkətinə avans da ödəyir. Ümumiyyətlə qeyd etmək lazımdır ki, lizinq ödənişlərinin xərclər maddəsində əks etdirilməsinə aydınlıq gətirmək üçün ilk növbədə onları müəyyənləşdirmək lazımdır. Azərbaycan Respublikası Mülki Məcəlləsinin 748. 10-cu maddəsinin müddəalarına görə lizinq müqaviləsinin qüvvədə olduğu müddət ərzində həmin müqavilə üzrə ödənişlərin ümumi məbləği lizinq ödənişləri hesab edilir **[4]**.

Sxem 2-də lizinq ödənişlərinin növləri və formaları daha aydın şəkildə verilmişdir.

"Aqrar bölmədə lizinqin genisləndirilməsi sahəsində əlavə tədbirlər haqqında" 23 oktyabr 2004-cü il tarixli, 466 №-li Azərbaycan Respublikası prezidenti sərəncamına əsasən Azərbaycan Respublikasının Vergi Məcəlləsinin 197-ci maddəsinə görə vergitutma obyektləri olan hüquqi və fiziki şəxslərin mülkiyyətində olan və Azərbaycan Respublikasının ərazisində yerləşən müəssisələrin balansında olan əsas vəsaitlərin orta illik qalıq dəyəri əmlak vergisinə cəlb edilir **[3]**. Lizinq ödənişləri lizinq müqaviləsi üzrə icarədara verilmiş lizinq predmetindən istifadəyə görə onun tərəfindən icarəyə verənin xeyrinə həyata keçirilən ödənişlərdir. Lizinq ödənişlərinin məbləği, həyata keçirilməsi üsulu, forması və dövriyyə lizinq müqaviləsinə uyğun olaraq Mülki Məcəllənin müddəaları nəzərə alınmaqla həyata keçirilir.

**Sxem 2**
**Lizinq ödənişlərinin növləri və formaları**




Lizinq ödənişlərinin ümumi məbləğinə aşağıdakılar daxildir.

-lizinq obyektinin əldə edilməsi ilə bağlı zəruri xərclər;

-lizinq obyektini əldə etmək üçün alınan kreditə görə faiz;

-lizinq verənin mükafatının məbləği;

-Lizinq obyekti lizinq verən tərəfindən sığorta ödənilmişdirsə, sığorta üçün ödənilən məbləğ;

-lizinq verənin əlavə xidmətlərinin haqqı;

-lizinq verənin lizinq müqaviləsi ilə nəzərdə tutulmuş digər xərcləri.

Lizinq verənin mükafatının məbləği tərəflərin razılığına əsasən aşağıdakı qaydada müəyyənləşdirilə bilər:

-qeyd edilmiş məbləğlə;

-lizinq predmetinin balans dəyərinə nisbətən faizlə;

-lizinq predmetinin orta illik qalıq dəyərinə nisbətən faizlə;

**Birinci halda** bütün mükafatın məbləği lizinq ödənişlərinin tərkibinə daxil edilir, onun aylıq həcmi isə bütün mükafatın məbləğinin lizinq müqaviləsinin fəaliyyət göstərdiyi ayların sayına bölmək yolu ilə müəyyənləşdirilir.

Tədqiqat apardığımız Aqrolizinq ASC-nin kənd təsərrüfatı məhsullarının istehsalı ilə məşğul olan müəssisə ilə bağladığı lizinq müqaviləsinə əsasən lizinq şirkətinə ödəniləcək mükafatın məbləği 24000 manata bərabərdir. Bu halda lizinq şirkətinə catacaq mükafatın aylıq məbləği 2000 manata bərabər olur (24000:12=2000).

**İkinci halda** mükafatın məbləği aşağıdakı kimi müəyyən ediləcəkdir.

M = R x Bd

M- mükafat;

R- əmlakın balans dəyərinə nisbətdə faiz dərəcəsi;

Bd- lizinq predmetinin balans dəyəri.

Tədqiqat aparılan Aqrolizinq ASC-nin digər bir müəssisə ilə bağladığı lizinq müqaviləsinə əsasən lizinq şirkətinə ödəniləcək mükafatın məbləği əmlakın balans dəyərinin 20 faizinə (R), əmlakın balans dəyəri isə 42000 manata (Bd) bərabərdir. Bu halda mükafatın ümumi məbləği 8400 manata (42000 x 20%), onun aylıq həcmi isə 700 manata (8400:12=700) bərabər olur.

M=R x Bd = 20% x 42000 = 8400

**Üçüncü halda** hesablamalar aşağıdakı düstur vasitəsi ilə aparılır:

M=(Dəv + Dq)\2 x R

Dəv- lizinq predmetinin ilin əvvəlinə olan dəyəri;

Dq- lizinq predmetinin ilin sonuna olan qalıq dəyəri;

R- lizinq predmetinin orta illik qalıq dəyərinə nisbətən faiz.

Tədqiqat apardığımız Aqrolizinq ASC-nin timsalında düsturu nəzərdən keçirək. Aqrolizinq

ASC-nin kənd təsərrüfatı müəssisəsi ilə bağladığı lizinq müqaviləsinə əsasən lizinq şirkətinə ödəniləcək mükafatın məbləği əmlakın balans dəyərinin 25 faizinə (R) bərabər olmalıdır. Lizinq predmetindən istifadə edilməsinə görə birinci il 18000 manat (1500 x 12 = 18000) məbləğində vəsat qaytarılmışdır. Lizinq predmetinin ilkin dəyəri 26000 manat (Dəv) ilin sonuna qalıq dəyəri isə 8000 manat (Dq) (26000-18000=8000) olmuşdur. Lizinq müqaviləsinin fəaliyyət müddətinin ikinci ilində 8000 manat vəsait ödənilmişdir.

Beləliklə, lizinq şirkətinə catacaq mükafatın məbləği aşağıdakı kimi hesablanacaqdır.

-birinci il üçün:

M = (Dəv + Dq) \ 2 x R = (26000 +8000) : 2 x 25% = 4250 manat

-ikinci il üçün:

M = (Dəv + Dq) \ 2 x R= (8000+0) : 2 x 25% = 1000 manat.

Lizinq şirkətinə ödəniləcək mükafat məbləği 5250 manat (4250+1000), onun aylıq həcmi isə 218,75 (5250:24) manata bərabər olacaqdır **[7]** .

**ƏDƏBİYYAT**

1. "Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkisafı Dövlət Proqramı"nda nəzərdə tutulmuş "Aqrolizinq"ASC-nin fəaliyyt dairəsinə aid olan tədbirlər. 2. "Lizinq Xidməti Haqqında" Azərbaycan Respublikasının Qanunu. 3. "Aqrar bölmədə lizinqin genisləndirilməsi sahəsində əlavə tədbirlər haqqında" 23 oktyabr 2004-cü il tarixli, 466№-li Azərbaycan Respublikası prezidenti sərəncamı. 4. Azərbaycan Respublikasının Mülki Məcəlləsinin. 5. "İcarə üzrə" Kommersiya Təskilatları üçün 14 № -li Milli Mühasibat Uçotu standartları. 6. Cahan Məmmədov "Aqrar bölmədə maddi-texniki təminat və xidmət isinin təskili", Bakı 2004. 7. Təhməzova A. Ə. "Lizinq münasibətlərinin tənzimlənməsinin dünya təcrübəsi", "Qloballasma və regional iqtisadi inkisaf" mövzusunda keçirilən beynəlxalq konfransın məqalələr toplusu, Bakı 2004. 8. Прилуцкий Л. «Финансовый лизинг» М, : ос-89, 1997. 9. Шпитмлер К. И. «Практический Лизинг /под ред» Б. Г. Дякина-М., 1991.

**Оценка эффективности и лизинговых оплатв предприятиях сельского хозяйства**

**З.Г. Гулиев**

В статье указывается о необходимости предоставления льгот предприятиям оказывающим лизинговые услуги. Предлагается освободить субьектов выдающих лизинг от оплаты нологов, полученных от продажи лизинговых договоров. Это освобождение косвенно будет способствовать к снижение цен на производимые продукты, снижению оплаты услуг и расширению производства.

В статье также указывается на пути решения тех задач которые, в соответствии с законодательством страны лизингодатель не может повторно использовать лизинговые предметы которые были получены от возврата со стороны лизингополучателя или конфискованы в результате дефолта лизингополучателем. Сельскохозяйственные предприятия получают прибыль от использования современного оборудования и производят оплаты от прибыли полученных от использования оборудований.

***Ключевые слова:*** *лизинговые оплаты, предмет лизинга, процент ссуды, нологовые льготы, страховые оплаты, формы оплаты, обьект лизинга, сумма премии лизинга.*

**The Central Bank, It's functions and duties**

**Z.G.Guliyev**

It's possible to keep the prices constant for a few days and to change the rates of national currency significantly as well due to the money-credit policy of the central banks. Central banks have a possibility to stop the production, to increase it rapidly, also, to raise the unemployment, or to eliminate it. Central Banks issues, in all countries with a market economy are based on same working principle. Everywhere they are managed by the instructions of the state and at the same time they are independent. Thus, the creation of central banks is a historical invention somewhere and it creates an opportunity in itself to save the independence of ownerships in the effective appropriation of market.

Besides, the essences and principles of central banks remains invariable and these principles are consist of mediation between state and economy and adjusting the credit flow to the country. Due to experiences, in the countries which the central banks are absolutely independent, there are political and economic stability, low level inflation and high economy development. Opposite to this, in the countries which the central banks are not independent, it's observed high level of inflation and instability.

***Keywords:*** *the issues of banknotes, the issue of money, a two-tier banking system, the state's banker, monopolist issue bank-notes, minimum reserve policy, diskant and lombard policy, open market policy,*

**zakirquliyev@inbox.ru**